# TƏHSİL VƏ TƏDRİS

İnsana bilmədiyini və qələmlə yazmağı öyrədən ALLAH`a həmd olsun! Onu bütün nöqsanlardan uzaq hesab edir və Ona həmd edirəm! Verdiyi nemətlər və lütflərə görə Ona şükr edirəm. Şəhadət edirəm ki, ALLAH`dan başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur. O, Təkdir və şəriki yoxdur. Ən Böyük və Kərəm sahibidir. Yenə şəhadət edirəm ki, Peyğəmbərimiz Muhəmməd ﷺ Onun qulu və Rəsuludur. O, ALLAH`a itaətə təşviq etmiş və pis olanlardan çəkindirmişdir. Zikr edənlər Onu xatırladıqca, doğru yoldan azanlar Onun hidayəti ilə getdikcə ALLAH ﷻ Ona, ailəsinə və əshabına xeyirdua etsin!

Sizlərə və öz nəfsimə ALLAH`dan layiqincə qorxmağı tövsiyə edirəm. ALLAH ﷻ belə buyurur:

***“Ey iman gətirənlər! ALLAH`dan layiqincə qorxun! Yalnız müsəlman olduğunuz halda (**müsəlman kimi**) ölün!”***[1]

İslam ümmətində tədrisin əhəmiyyəti böyükdür. Ümmət mənsublarının və gəncliyinin formalaşdırılmasında aktiv rol oynayır. Gənclik, cəmiyyətlərin və dövlətlərin əsasını təşkil edir. İslamın ilk dövrlərindəki parlaq tədris, ümmətin ehtiyaclarına səsləndi və yetkin nəsillər yetişdirdi. Ümməti idarə olunan deyil, idarə edən, alçalan deyil, üstün olan, başqalarına tabe deyil, ona tabe olan, aldığından daha çoxunu verən ümmətə çevirdi.

Yeni gələn nəsillərin istiqamətləndirilməsində, imanlı olub fitnələrdən qorunmasında təhsil və tədris adamlarına böyük məsuliyyət düşür. Təhsil məqsədlərinə və üstün məqsədlərə barmaqarası baxaraq, tədrisi maddi səviyyənin yüksəlməsinə vasitə olaraq

1 Ali-İmran surəsi, 3/102.

görmək İslam ümmətinə yaraşmır. Uşaq tədrisə boş qab kimi daxil olur. Günlər və illər keçdikdən sonra tədris ocaqlarında əxlaqını formalaşdırmaq, düşüncə metodunu və həyat yolunu mükəmməlləşdirmək üçün öyrəndiyi davranışlardan istifadə edir. Beləliklə tədris, cəmiyyətin və ümmətin şəxsiyyətinin formalaşmasını, dəyişməz və müqəddəs dəyərlərinin ortaya çıxmasını təmin edir.

Yeni təhsil qurumlarının çoxluğu ilə yanaşı müsəlmanlar olaraq bəzən doğruluğu danılmaz olan həqiqətləri ya unuduruq, ya da vaxt keçdikcə onları görmürük. Məsələn, tədrisin əsas funksiyası, yeni nəsilləri, İslami dəyərlər və Rəsulullahın ﷺ gətirdiyi prinsiplərlə inancında, hiss və davranışında, həyatın hər sahəsində İslama boyun əyən və ALLAH`a عز وجل səcdə edən, ALLAH`ın عز وجل ayələrini eşitdiyi zaman kövrəlib ağlayan, Onun rəhmətini uman və əzabından çəkinən insanı tərbiyə etməkdir.

Millətlər, bilik yığını ilə irəliləmir. Əksinə, ağızlarda çeynənən, həyatda heç bir qarşılığı və davranışlara heç bir təsiri olmadan imtahan otaqlarında danışılan əzbərlənməsi üçün deyil, təcrübədə göstərilməsi üçün müqəddəs dəyərlər nümayiş etdirən və ortaya prinsiplər qoyan təhsillə irəliləyir. Tədrisin əsas məqsədinin şüurları gəlişigözəl sözlərlə doldurmaq, mənalarına diqqət etmədən mətnlərin hər bir hərfini əzbərləmək olduğunu nəyinki təhsil adamları, hətta heç bir adi insan deyə bilməz. Həqiqətən yeni nəsillərin təhsilini və onların mükəmməl tərbiyə edilməsini istəyiriksə, maddi məlumatlar və təcrübə səviyyəsindən asılı olmayaraq, təkcə bununla şəxsiyyətin əmələ gəlməyəcəyini, hətta insanlığı xeyirli fəaliyyətə sövq etməyəcəyini bilməliyik. Çünki insanlığı xeyirli fəaliyyətə sövq edən sadəcə yüksək dəyərlərə və böyük prinsiplərə olan inancdır.

Tədris metodlarını dərindən, qəlbə toxunmadan və davranışa çevrilmədən əzbərləməklə kifayətlənmək faydasızdır. Nəfslər və ruhlara diqqət yetirilmədən ağıl və şüurlarla necə dialoq qurmaq olar?..

Tədrisin vəzifəsi bilik verməzdən əvvəl bu biliyi mənfi yolda deyil, müsbət yolda, insanlığın zərərinə deyil, faydasına istifadə edəcək ürəyi əmələ gətirməkdir. Buna görə də təhsildən başqa məqsəd güdülməməlidir. Şübhəyə düşməməsi və şəhvətə meyl etməməsi üçün inancı sağlamlaşdıran və qəlbin dərinliklərinə yerləşdirən təhsil... Oyun və əyləncədən, azğınlıqlardan uzaq, imanla dolu təhsil... Əsası, Quran və sünnə, metodu ümmətin sələfinin anlayışı, vəzifələri nəfslərin təmizlənməsi olan təhsil... Nəfsin böyük işlərə bağlanmasını və səviyyəsiz işlərdən uzaq olmasını, yalnız ALLAH ﷻ üçün razı olmasını və yalnız ALLAH ﷻ üçün qəzəblənməsini, ALLAH ﷻ üçün sevməsini və ALLAH ﷻ

üçün düşmənçilik etməsini təmin edən təhsil... İmanla dolu qəlblərə olan ehtiyacımız biliklə dolu beyinlərə olan ehtiyacımızdan heç də az deyil. Təki, yeni yetişən gənc, dünyaya əzab yayan şeytana çevrilməsin. Təki, narkotik maddələr, azğın düşüncələr və inanclar onu müxtəlif yollara sürükləməsin. Rəsulullah ﷺ insanı iman etdiyi zaman istəyi ilə baş-başa buraxmır, əksinə təhsil və tədrislə onu dəstəkləyir, səhabələrinə bunu öyrədirdi. Umeyr ibn Vəhb رضي الله عنه müsəlman olduğu zaman, Rəsulullah ﷺ səhabələrinə belə buyurdu:

*"Qardaşınıza dinində bilik verin və ona Quran oxumağı öyrədin."*

Əhməd ibn Hənbəl رحمه الله, Əbu Abdi`r-RAHMAN`dan رحمه الله belə dediyini rəvayət edir:

"Bizlərə Peyğəmbərin ﷺ əshabından bəhs edənlər, onların Rəsulullahdan ﷺ ayələri on-on öyrəndiklərini, onları yaxşı mənim-

səmədən başqa on ayəyə başlamadıqlarını deyirdilər.”

Sələfi Salehimiz uşaqların müəllimlərini “Təhsil verən” və “mürəbbi” olaraq adlandırırdılar. İbn Mübarək ﷺ belə deyir: “Otuz il ədəb, iyirmi il elm öyrəndik.”

İbn Sirin ﷺ belə deyir: “Elm öyrəndikləri kimi hidayəti öyrənirdilər.” İbn Mübarək ﷺ, Həsən əl-Basridən ﷺ belə dediyini rəvayət edir: “Biz, hədisdən çox ədəbə möhtacıq.”

Nəticəsi müsbət olan təhsil, tədrislə yanaşı olan təhsildir. Təhsil və tədris bir-birini zəruri edir. Təhsilsiz tədrisdə heç bir fayda və təminat yoxdur. Təhsillə tədrisi bir-birindən ayırmaq imanı zəif, şəxsiyyətsiz düşüncələri və anlayışları qarışıq, heç bir dəyərə əhəmiyyət verməyən bir nəsil ortaya çıxarır, dağıdıcı düşüncələrə və axınlara asan ov olur, biliyini və zəkasını, özünün və cəmiyyətinin bəd-

bəxtliyi üçün istifadə edir. Sahibi yalançı və xain, rəzilliklər içində olan, əxlaqı və davranışlarıyla bütün təhsil prinsiplərini pozan birisi olsa, o elmin nə qiyməti olar?! Elm alanın elmi, müəllimlərinə, yoldaşlarına və kitablarına əks olunmasa, o elmin nə qiyməti olar?! Tədris sadəcə əzbərlənən kitab, verilən bilik və ya tələbələrin nizamlı şəkildə partada oturduğu siniflər deyil, əksinə yeni nəsil hazırlamaq və tərbiyələndirmək, inanc əmələ gətirmək və anlayışları sağlamlaşdırmaq, əxlaq və prinsiplər təşkil etməkdir. Hər hansı bir ümmətin daimiliyi inanc, əxlaq və nəsildən-nəslə ona çatan tarix kimi əsas amillərə diqqət yetirmə qüvvəsinə bağlıdır.

Ümmətin əxlaqi problemləri təhsilə biganə yanaşıldığı və ya təhsillə tədris arasında ayrılıq olduğu zaman ortaya çıxır və cəmiyyətlər bu problemlərin oduna yanır. Elmi irəliləyişə böyük dəyərlər və əxlaq qaydaları qoşulmasa, bu irəliləyişin sonu olmaz. Qısa

zaman ərzində iki dünya müharibəsi yaradan, bütün bəşəriyyəti yox olmaq təhlükəsilə üz-üzə qoyan bu sivilizasiya deyilmi?

Müasir sivilizasiya, elmi irəliləyişə baxmayaraq, əxlaq məsələlərində çox geri qalmışdır. İslam ümməti arasında da inanc, düşüncə və əxlaqda problemlər baş verir. İmani dəyərlərə və Rabbani istiqamətləndirməyə üz tutmaqdan başqa bu problemlərin həlli yoxdur. Bu səbəbdən təhsil adamları belə deyir: Reformdakı ilk iş də təhsil, son iş də təhsildir.

Təhsil metodu, davranışları, hərəkətləri, hiss və düşüncələri ilə o metodun məna və prinsiplərini əks etdirən insana çevrilmədikcə kağız üzərində qalmaqda davam edəcək.

Yeni gələn gənclərimizin gözü saxtakarlıq görməyib, qulaqları yalan eşitməsə, rəzalətlə əhatə olunmasa doğru tərbiyə alarlar. Əgər onlara sərt və kobud davranılmasa, hala

acımanın nə olduğunu öyrənərlər. Cəmiyyət xainliyin kökünü kəssə, onlar təhlükəsiz həyat tərzi keçirərlər. əl-Buxarinin رحمه الله *"əs-Sahih"* əsərində rəvayət edilən bir hədisdə belə bildirir: "Abdullah İbn Abbas رضي الله عنهما, Rəsulullahın ﷺ qalxıb gecə namazı qıldığını görür. O da tez qalxaraq Rəsulullahla ﷺ birlikdə gecə namazı qılır."

Bizlər hər faydalı müasir elmdən istifadə etməkdə məsuliyyət daşıyırıq. Bu böyük qarışıqlıqda müasir elmləri şübhələrdən və mənfi cəhətlərdən təmizləməyin zəruriliyi də yaddan çıxarılmamalıdır. Çünki bu elmlər, azğın mədəniyyət analyışlarının ortaya çıxardığı materialist düşüncə qəliblərinə tökülmüş, elmlə din arasında problemlər olan bir cəmiyyətdə ortaya çıxmışdır. Bu ziddiyyətin sonu dinə və dəyərlərə biganəliklə bitir.

Müasir elm və texnika onu saflaşdıracaq süzgəcdən və yenidən formalaşdıracaq sağlam beyinlərdən asılı olmadan bütün gizli

tərəfləri ilə sərbəst olmamalıdır. Texniki elmləri, təbiət elmlərini, psixologiyanı, astrologiyanı, sosiologiyanı və digər elm sahələrini rədd etmirik. Bunlara əsaslanan dinə zidd fəlsəfələri isə, onun prinsipləri iman, metodları isə İslam çərçivəsinə düşənə qədər qəbul etmirik. Bu şəkildə bütün elmlər, kəliməyi-tövhidlə parlayan sıraya girir. Onun hər bir hissəsi ALLAH`ı ﷻ hər cür nöqsandan uzaq hesab edir, Onun gücünü və birliyini qəbul edir. Beləliklə elmlər bir-birinə sıx bağlı olur və müxtəlif metodlardakı məlumatlar tədris məqsədləri ilə yanaşı davranışla əlaqəli olan məqsədləri həyata keçirmək üçün də istifadə edilir. Nəticədə tələbə ədəb və fəziləti, elm və imanı özündə birlikdə əks etdirir. Tədris metodunun hər bir maddəsi dinlə əlaqəli olur, dinə xidmət edir və dinin mənasını dərinləşdirir.

ALLAH ﷻ belə buyurur:

“(*Əksəriyyəti yazıb-oxumaq bilməyən*) ***ümmi ərəblərə özlərindən peyğəmbər göndərən Odur.*** (*Bu Peyğəmbər*) ***əvvəllər haqq yoldan açıq-aşkar azsalar da, onlara*** (*ALLAH`ın*) ***ayələrini oxuyar, onları*** (*günahlardan, şirk və küfr çirkabından*) ***təmizləyər, onlara Kitabı və hikməti*** (*Quranı və şəriəti*) ***öyrədər.***”[2]

ALLAH məni və sizləri müqəddəs Quranla şərəfləndirsin...

Nemətləri və xeyirləri bol verən ALLAH`a həmd olsun! Hər cür nöqsandan uzaq hesab edərək Ona həmd edirəm! Ondan, daim doğru əməllərdə müvəffəq etməsini diləyirəm! Şəhadət edirəm ki, ALLAH`dan başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur. O, Təkdir və şəriki yoxdur. Şəhadət edirəm ki, Peyğəmbərimiz Muhəmməd, Onun qulu və Rəsuludur. ALLAH ﷺ Ona və ailəsinə, ALLAH`a verdikləri sözə əməl edən

---

2 əl-Cum`a surəsi, 62/2.

və çətinliklərə səbr edən səhabələrinə xeyir-dua etsin!..

Tədris, kişi və qadın üçün zəruridir. Kişi və qadın fərqli xüsusiyyətlərə malik olduğu üçün hər bir insanı həyatdakı təbii vəzifələrinə hazırlayan təhsil proqramlarına laqeyd qalmamalıyıq. Məsələn, gənc qız faydalı məlumatlara yiyələnməklə yanaşı, ana və ev xanımı kimi uşaqlarına tərbiyə verən və qəhrəmanlar böyüdən birisi kimi də əsas vəzifəsinə hazırlanmalıdır. Kişi də, elm və hikmətlə ailəni idarə edən ailə başçısı kimi tərbiyə olunmalıdır.

Tədris mərhələlərinə daxil olmaqla ailə və ailə ilə bağlı mövzularda proqramlar hazırlamaq ailələrin bugünkü vəziyyəti üçün zərurətə çevrilmişdir. Bu gün ailələr həssas məsələlər və ailə bağlarının zəifliyi kimi problemlərlə qarşılaşır. Boşanma və evlənməmə nisbətinin yüksək olması ilə yanaşı ailə həyatının əsas amillərindən, uşaq təhsili prinsiplə-

rindən və ailəvi problemlərə yanaşma incəliyindən də xəbərsizdirlər.

***Abdu`l-BARİ əs-SUBEYTİ***
***06/07/1423 Hicri – 13/09/2002 Miladi***